






Azərbaycan Respublikası
Elm Və Təhsil Nazirliyi



Naxçıvan Dövlət
Universiteti


Azərbaycan Respublikası
Elm Və Təhsil Nazirliyi
Botanika İnstitutu



Azərbaycan Botaniklər Cəmiyyəti
İctimai Birliyi

# Biomüxtəlifliyin dayanıqlığının təmin edilməsində yeni çağırışlar (COP29)

# YAŞIL DÜNYA VƏ İNSAN SAĞLAMLIĞI

## Beynəlxalq Elmi-Praktiki Konfrans

3-4 iyun 2024
Naxçıvan şəhəri




Naxçıvan Muxtar Respublikasının 100 illik yubileyinə həsr edilmiş

# "BİOMÜXTƏLİFLİYİN DAYANIQLIĞININ TƏMİN EDİLMƏSİNDƏ YENİ ÇAĞIRIŞLAR (COP29)-YAŞIL DÜNYA VƏ İNSAN SAĞLAMLIĞI"

adlı Beynəlxalq Elmi-Praktiki Konfransın Materialları

**Təşkilatçı qurumlar:** *Naxçıvan Muxtar Respublikasında Azərbaycan Respublikası Prezidentinin səlahiyyətli nümayəndəliyi*

*Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi*

*Naxçıvan Dövlət Universiteti*

*AR ETN Botanika institutu*

*Azərbaycan Botaniklər Cəmiyyəti İctimai Birliyi*

**MÜNDƏRİCAT**

## *Naxçıvan Muxtar Respublikasının bioloji müxtəlifliyinin müasir vəziyyəti və istifadə imkanları*

## *Flora və faunanın müasir vəziyyətinin təhlili*

# TƏBİƏTİN EKOLOGİYA QORUYUCUSU-BAL ARISI

Tahirov Ə.S., Rüstəmli Y.M.
Naxçıvan Dövlət Universiteti
E-mail: alitahirov@ndu.edu.az, yunisrustamli@ndu.edu.az

Bal arısı *(Apis mellifera* L.) bütün gün ərzində gül-çiçəklikdə işlədiyindən etibarlı tozlandırıcı sayılır və bitkilərin məhsuldarlığının artırılmasında mühüm rol oynayır. Müəyyən edilmişdir ki, arı ailəsi bir mövsümdə pətəyə 20 kq-a qədər çiçək tozu daşıyır. Arı bir gündə 1200 hektar sahəni gəzir. Bir kiloqram bal toplamaq üçün 120-150 min dəfə uçmalı, 5-10 milyonadək çiçəyə qonmalıdır. Beləliklə, arılar bitkiləri tozlandırmaqla da böyük xeyir verir, onların məhsuldarlığını xeyli (20-30, bəzən 50%) artırırlar.

Mütəxəssislərin fikrincə 115 növ kənd təsərrüfatı bitkisinin məhsuldarlığı bal arısı və digər tozlandırıcı həşəratların fəaliyyəti ilə bilavastə bağlıdır. Ərzaq bitkilərindən 87-nin 13-ü tamamilə, 30-u qismən, 27-si isə az bir dərəcədə tozlandırıcı həşəratlardan asılıdır. Tozlandırıcıların sayəsində dünyanın 200 ölkəsində ərzaq məhsullarının 35 %-i istehsal edilir.

Arılar təbiətdə növ müxtəlifliyinin qorunmasında bir növ qarant rolu oynayırlar. Harada ki, arılar vasitəsilə tozlama işi kifayət qədər deyilsə, o ərazilərdə təbii otlardan bir çox qiymətli entomofil (həşəratla tozlanan) bitki növləri azalır və tədricən yoxa çıxır. Bundan belə nəticəyə gəlmək olar ki, vəhşi heyvanların, eləcə də otyeyən heyvanların yem bazasının lazımi səviyyədə saxlanması birbaşa olaraq tozlayıcılardan asılıdır. Odur ki, bu vacib məsələnin öhdəsindən gəlmək üçün arıçılığın inkişafı diqqət mərkəzində saxlanılmalıdır.

Son illərdə təbiətdə baş verən qlobal iqlim dəyişmələri, müxtəlif istiqamətli və miqyaslı antropogen fəaliyyətlərin mənfi təsirləri bal arılarının yem ehtiyatlarının tükənməsi və keyfiyyətinin aşağı düşməsi, gen ehtiyatlarının ciddi çirklənməsi, xəstəliklərin genişlənməsi və yeni təhlükəli xəstəliklərin meydana gəlməsi, arı ailələrinin sayının sürətlə azalması, məhsuldarlığın və alınan məhsulların keyfiyyətinin aşağı düşməsi kimi ciddi fəsadlarla özünü büruzə verməkdədir.

Artıq daha çox sənayeləşmiş və urbanizasiyalaşmış bir çox ölkələrin mövcud iqlim şəraitləri bal arılarının normal yaşamını təmin edə bilmədiyindən, bu ölkələr bal arılarının kütləvi qırğını sindromu deyilən olduqca təhlükəli problemlə qarşılaşmışlar. Sindromun qorxunc nəticələri arıçılar və arıçı alimlərlə yanaşı bir çox dövlətləri, nəhəng aqrobiznes və qida sənayesi kompaniyalarını da narahat etməyə başlamışdır. Bal arılarının və digər tozlayıcıların sayının bu şəkildə azalmasının məntiqi sonu dünyada bir çox ərzaq məhsullarının istehsalının kəskin azalması və qiymətlərinin artımı, sosial-iqtisadi problemlərin gərginləşməsi və ciddi ekoloji fəlakətlər deməkdir. Böyük alim Albert Eynşteyn əbəs yerə deməmişdir: "*Arının məhvindən dörd il sonra yer kürəsində insan həyatı məhvə məhkumdur*".

Mütəxəsisslərin hesablamalarına görə mədəni kənd təsərrüfatı entomofil bitkilərin tozlandırılmasında lazımı qədər arı ailələri istifadə edilərsə: günəbaxanda 25-50%, pambıq istehsalında 34-40%, alma-armudda 50-60 %, qavun-qarpızda 95-100% , digər meyvələrdə 10-90% və tərəvəzdə 10-90% artım müşahidə edilir.

Arıçılığın inkişafı ilk növbədə onun yem bazası ilə əlaqədardır. Azərbaycanın florası nektarlı bitkilərlə zəngindir. Respublikanın coğrafi iqlim şəraiti burda mövcud olan 600 növ bal verən bitkilərin müxtəlif vaxtlarda çiçəkləməsinə səbəb. Arıçılığın inkişafı eyni zamanda mövcud arı cinsləri və populyasiyalarının damazlıq-seleksiya keyfiyyətlərini yaxşılaşdırmaq və yem bazasından səmərəli istifadə etməkdən asılıdır.

Beləliklə, bal arısı entomofil bitkilərin məhsuldarlığının təbii yolla artırılmasında və ekoloji təmiz məhsulların istehsalında mühüm amildir.